UOT: 581.526.3

# ARAN ŞİRVANIN OTLAQ SAHƏLƏRİNİN MÜASİR VƏZİYYƏTİ

**T.E.QASIMZADƏ**
**AMEA Botanika İnstitutu**

*Məqalədə aran Şirvanın otlaqlarının müasir vəziyyəti, tutumu və məhsuldarlığı barədə məlumat verilmişdir. 2015-2017-ci ildə Şirvanın aran ərazilərində monitorinq qiymətləndirilmə aparılmaqla, hər baş mal-qaraya norma ilə nəzərdə tutulan yemin miqdarı yem vahidi ilə hesablanmışdır. Belə ki, aran Şirvanda 1053137 baş iri buynuzluya 31594, 11 ton yem vahidi, 235382 baş xırda buynuzluya isə 70614,84 ton yem vahidi düşür. Ərazinin 345170 ha olan qış otlaqlarında 3406965 baş mal-qaraya (1053137 baş iri buynuzlu, 2353828 baş xırda buynuzlu) 2248596, 90 ha otlaq sahəsi ayrılmalıdır. Ancaq mövcud olan otlaq sahəsi lazım olandan 1903426, 90 ha azdır.*

***Açar sözlər:*** *aran Şirvan, otlaq, məhsuldarlıq, bitki örtüyü*

Arid ərazilərin bioloji potensialının kənd təsərrüfatında böyük əhəmiyyəti vardır. Belə ki, arid ərazilər ən çox dəmyə şəraitində təbii otlaqlar kimi istfadə olunur. Onların yem ehtiyatı hesabına yüksək keyfiyyətli heyvandarlıq məhsulları: ət, süd, yağ və s. istehsal olunur. Bu arid ərazilər digər sənaye əhəmiyyətli heyvanların qorunub saxlanmasına şərait yaradır. Alimlər arid ərazilərin bioloji potensialının müəyyən edilməsinin və həmçinin elmi əsaslarla mobilləşdirilməsini xalq təsərrüfatının aktual məsələsi hesab edir [4].

Arid ərazilərdən istifadə prossesinin sistemli idarə olunması vacib məsələlərdən biridir. Dünyanın hər yerində arid ərazilərin təbii ehtiyatlarından səmərəli və davamlı istifadə olunması günün aktual problemlərindəndir. Alimlər səhralaşma prosesində başlıca faktorlardan birinin mal-qaranın qaydasız otarılmasında görür [5].

Belə ki, aran Şirvan düzənliklərində aparılan tədqiqatların nəticələri subut edir ki, ərazidə bitki və torpaq örtüyünün deqradasiyası nəticəsində səhralaşma prosesi kompleks ekoloji və antropogen amillərin təsiri altında daha sürətlə davam edir [6]. Səhralaşma təkcə aran yerlərin quraq ərazilərində deyil, eyni zamanda bozqırlarda, quru dağ yamaclarında (qariqa, friqana), dağ çəmənlərində, yüksək dağ bozqırlarında və hətta su hövzələrində də özünü biruzə verir. Bu da ərazinin otlaqlarının və məhsuldarlığının öyrənilməsinə zəmin yaradır.

## Material və metodika

Tədqiqat işi 2015-2017-ci illərdə Şirvanın aran ərazilərində həyata keçirilmişdir. Geobotaniki tədqiqat işlərinin aparılmasında ümumi qəbul edilmiş "Методика фенологический наблюдений при геоботанических исследованиях" [2], "Методология оценки устойчивости почв к деградации" [8], P.D. Yaroşenko [10], Ramenski L.Q. [7], Şennikov İ.N. [9] və digər metodikalardan istifadə edilmişdir. Bu metodlara əsasən nümunə və hesablama meydançaları seçilir, meydançaların ölçüsü təbii fitosenozların böyüklüyündən asılı olaraq müxtəlif ola bilər. Nümunə meydançalarında bitkilərin növ tərkibi, bolluğu, üstünlük təşkil edən (edifikator, dominant subdominant və b.) taksonlar, layihə örtüyü, həyatiliyi, sıxlığı, mərtəbəliliyi, çəki üsulu ilə fitosenozun, həmçinin ayrı ayrı təsərrüfat qruplarının (yem, dərman, efiryağlı, yabanı qida və s.) məhsuldarlığı, təbii ehtiyatı öyrənilir. Bolluğu öyrənmək üçün daha çox Drudenin 6 ballı şkalasından istifadə olunur.

1.Soc. (sociales) - bitki yerüstü hissəsi ilə biri-birinə söykənir, fon əmələ gətirir;

2.Cop.3 (copiosae$_3$) - bitki çox bol rast gəlinir;

3.Cop.2 (copiosae$_2$) - bitki daha bol rast gəlinir;

4.Cop.1 (copiosae$_1$) - bitki ən bol rast gəlinir;

5.Sp. (sparsae) - bitki tək-tək, seyrək rast gəlinir;

6.Sol. (solitariae) - bitki olduqca az miqdarda, nadir nüsxə ilə rast gəlinir

Göründüyü kimi Drude bolluq şkalasını rəqəmlərlə deyil, söz birləşmələri ilə ifadə etmişdir.

Ehtiyatın hesablanmasında aşağıdakı riyazi formuldan istifadə edilmişdir.

$$M = \frac{\sum V}{n}$$ Burada:

$M$ - orta hesabi kəmiyyət; $\sum V$ - seçilmiş nümunə meydançalarından toplanılmış otun (*Herba*) orta yaş çəkilərinin cəmidir. n-nümunə meydançalarının sayıdır.

Ərazidəki yem sahələri isə "Təbii yem sahələrinin tədqiqat metodikası" [1] əsasında öyrənilmişdir.

## Nəticələr və müzakirələr

Şirvan Azərbaycanın ən böyük akkumulyasiya sahələrindən biridir və bir neçə geomorfoloji rayonlara ayrılır: Dağətəyi düzənliklər. Bu geomorfoloji rayon daxilində: Qarabağ-Mil təpəli-

tirəli dağətəyi düzənliyi; Ovalıq düzənlikləri rayonuna Şirvan, Qarabağ-Mil, Cənubi Muğan maili düzənlikləri, Mil-Muğan alluvial ovalıq düzənliyi yarımrayonları daxildir; Salyan delta ovalığı və Cənub-şərqi Şirvanın sahil ovalığı yarımrayonları daxildir. Salyan və Muğan düzənliklərinin sərhəddində şoran çökəklər, cənub-şərqi Şirvanın sahil ovalığı yarımrayonunun şərq hissəsini tamamilə qumlu düzənlik təşkil edir [11]. Şirvanın aran hissəsinin əsasını tutan Kür-Araz ovalığının böyük hissəsini tutan Mil, Muğan və Şirvan düzləri dördüncü dövrün deluvial, proluvial və alluvial çöküntüləri ilə örtülmüşdür.

Adi çəmən torpaqlar daha çox Qarabağ, Şirvan, Mil, Muğan və Salyan düzənliklərində geniş sahələri əhatə edır. Çəmən torpaqlarının mexaniki tərkibi ağır gillicə və gillərdən ibarət olur. Şirvan düzündə belə torpaqlarda suvarmadan və yağışdan sonra möhkəm qaysaq əmələ gəlir [3]. Qaysaqlı şoran torpaqların xarakterik cəhəti odur ki, onların üzərində duz qabığının qalınlığı 1-2 sm-dən 5-10 sm-dək olur. Belə torpaqlara Qarabağ və Şirvan düzlərində təsadüf edilir. Bu torpaqların içərisində şorlaşmış növlərə də təsadüf edilir. Şorlaşmanın əsas səbəbi yerin səthinə daha yaxın olan qrunt sularının isti iqlim şəraitində torpaqdan buxarlanmasıdır. Buxarlanma getdikcə qrunt sularında həll olmuş duzlar torpağın üst qatını və bəzən onun bütün laylarını şorlaşdırır. Duzların miqdarı torpağın səthində 3,0%-dən artıq olur ki, bu da torpağı şorana çevirir. Belə torpaqlar yayılan sahələrdə, şorakətləşmə əlamətləri də müşahidə edilir. Bu da öz növbəsində torpağın məhsuldarlığına öz neqativ təsirini göstərir.

Allüvial-boz, həmçinin şorakət torpaqlarını səciyyələndirmək üçün aran Şirvanın Ağdaş, Yevlax, Ucar, Kürdəmir və Şirvan rayonlarının ərazilərində torpaq kəsimləri qoyulmuşdur.

I. Şorakət torpaqlar ərazidə geniş yayılmışdır. Son dövrlərdə baş vermiş qlobal iqlim dəyişiklikləri, antropogen təzyiqlər, təkrar şorlaşma onların sahəcə genişlənməsinə şərait yaratmışdır. Tədqiq olunan torpaqlarda səhralaşma sürəti getdikcə intensivləşir. Bu prosesdə həddindən artıq otarma böyük rol oynayır. Şorlaşmış torpaqlar Kürdəmir, Ucar, Ağdaş, Zərdab rayonlarının ərazisində xüsusilə xarakterikdir. Belə torpaqların mexaniki tərkibini, morfoloji xüsusiyyətlərini müəyyən etmək məqsədilə torpaq kəsimləri qoyulmuşdur.

A – 0-30 sm - ortagilli, açıq-boz, zəif qonurtəhər, möhkəm olmayan kəltənli, üzəri barıtvari, yalançıdənəvər səpgi ilə örtülmüş, ayrı-ayrı kəltənlər, çoxşaxəli çatlar, sıxtəhər, duzların nazik nöqtələri, quru, qaynayır, keçid tədricidir.

B – 30 -73 sm - ortagilli, aydın olmayan kəltənli, sıx, duzların çox nöqtələri, quru, qaynayır, keçid aydındır.

$B_1$ – 73-100 sm - ortagilli, bozumtul-qonur, struktursuz, sıxtəhər, duzların çox nöqtələri, quru, qaynayır, keçid tədricidir.

C – 100-150 sm – mexaniki tərkibinə görə yüngül, boz, struktursuz, sıxtəhər, duzların çox nöqtələri, təzə, qaynayır.

Aran Şirvanda yarımsəhra və lokal bitki tipləri üstünlük təşkil edir. Rütubətli çökəklərdə çala-çəmən və bataqlıq bitkilərinə rast gəlinir. Ən geniş yayılan yovşanlı, yovşanlı-şoranlı, şoranlı, efemerli və ləkələr şəklində rast gəlinən bitkiliklərdir. Azərbaycanda bir sıra yaşayış mühitləri və bitki birlikləri nadirdir və təhlükə altındadır. Bura dənizkənarı psammofit bitki senozları, tuqay meşələri, bir çox səhra və yarımsəhra senozları və bu senozlarda olan bitki növlərindən bakı gəvəni - *Astragalus bakuensis* Bunge, xəzər xəşənbülü - *Melilotus polonicus* (L.) Pall. (*M. caspicus* Grun.), bakı cuzğunu - *Calligonum bakuensis* Litv., şober şorgiləsi - *Nitraria schobera* L., xəzər şanagülləsi - *Nelimbium caspica* (DC.) Fisch., ağ suzanbağı - *Nympha alba* L., qalxanyarpaq bataqlıqçiçəyi - *Nymphoides peltata* (S.G. Gmel.) O. Kuntze və b. daxildir. Yarımsəhra bitkiliyi Şirvan, Mil, Qarabağ, Muğan, Salyan düzlərində geniş sahə tutur. Yarımsəhraların fiziki-coğrafi şəraiti səhralara nisbətən bitki örtüyünün inkişafı üçün əlverişlidir. Burada yağıntının miqdarı az olub, əsasən yaz və payız aylarında düşür. Quraqlıq dövrü 4-5 ay davam edir. Buradakı bitki formasiyalarında mövsümi dəyişkənliklər müşahidə edilir. Belə ki, bitki örtüyü yazda inkişafa başlayır, yayda vegetasiya sönür, payızda yenidən bərpa olunur və bütün qışı davam edir. Ot örtüyünün vegetasiyası bu mövsümi mərhələlərdə baş verən dəyişikliklər səhralaşma prosesinin inkişafı ilə mütənasibdir. Yarımsəhra bitkilərinin yayıldığı ərazilərdə suvarma ilə pambıq, yonca, qismən bostan bitkiləri, tərəvəz, üzüm becərilir.

Qalan torpaqlar qış otlaqları kimi istifadə edilir. Suvarma əkinçiliyinin inkişafı ilə əlaqədar bu ərazilərin sahəsi ildən-ilə azalır. Təmiz efemer fitosenozların məhsuldarlığı iqlim şəraitindən asılı olaraq illər üzrə çox dəyişilir. Ərazidəki yovşanlı-efemerli yarımsəhralar otlaq kimi istifadə edilir.

Hazırda səhra landşaftı fraqmentləri də aran Şirvanda yayılmışdır. Burada səhra fraqmentlərinin şoranlı gilli-takıra bənzər və çınqıllı gipsləşmiş tiplərinə rast gəlinir. Onların yaranmasına və inkişafına quraq iqlim şəraitində otlaqlardan səmərəli istifadə olunmaması nəticəsində, bitki örtüyünün seyrəkləşməsi, torpağın üst münbit qatının yuyulması və şorlaşması səbəb olmuşdur. Aran Şirvan sahələrində səhra tipli bitkiliyə, yarımsəhra bitkiliyinə nisbətən az və ya ləkələr şəklində rast gəlinir.

Ovalıqda səhra bitkiliyi, əsasən, Mil, Muğan və Şirvan düzlərində rast gəlir. Torpağın duzluluq

dərəcəsindən asılı olaraq burada qaraşoran, xəzər şahsevdisi - *Halostachys caspica* (Pall.) C.A. Mey. kimi çoxillik, ətli şoran - *Salsola crassa* Bieb., budaqlı qışotu - *Petrosimonia brachiata* (Pall.) Bge. kimi birillik şoran bitkiləri vardır. Səhra bitkiləri yarımsəhra bitkilərindən torpağın daha duzlu olması, birillik efemerlərin az yayılması və şoran bitkilərin seyrəkliyi ilə fərqlənir. Araz ətrafı ərazilərdə iyli yovşan (*Artemisia fragrans* Willd.) daha çox yayılmışdır. Aran Şirvanın yem ehtiyatını təşkil edən bitkilərindən birillik efemerlər, yovşan, qarağan, gəngiz və b. geniş yayılmışdır (cəd.1).

**Cədvəl 1**

**İyli yovşanın dominantlığı ilə yaranmış fitosenozun növ tərkibi və quruluşu**

| № | Bitkilərin adı | Dolğunluq | Hündürlük, sm | Fenofaza | Yarus | Həyat forması |
|---|---|---|---|---|---|---|
| 1 | *Halostachys belangeriana* (Moq) Boiss. | 4 | 350-dək | çiçək | I | kolcuq |
| 2 | *Hordeum leporina* (L.) Sternb. | 2 | 10-40 | meyvə | III | birillik |
| 3 | *Camphorosma lessingii* Litv. | 2-3 | 10-35 | meyvə | III | yarımkol |
| 4 | *Adonis flammeus* Jacq. | 2-3 | 10-50 | meyvə | II | birillik |
| 5 | *Petrosimonia brachiata* (Pall.) Bunge | 3 | 5-50 | meyvə | III | birillik |
| 6 | *Eromopirum triticeum* Nevski | 2-3 | 10-30 | meyvə | III | birillik |
| 7 | *Spinacia tetrandra* Stev. | 1-2 | 10-40 | meyvə | III | birillik |
| 8 | *Tribulus terrestris* L. | 2 | 10-60 | çiçək, meyvə | II | birillik |
| 9 | *Suaeda microphylla* Pall. | 1-2 | 25-75 | çiçək | II | kolcuq |
| 10 | *Aegilops sylindrica* Host | 2-3 | 25-40 | meyvə | III | birillik |
| 11 | *Hedypnois cretica* (L.) Dum.-Cours. | 1-2 | 10-15 | çiçək, meyvə | III | birillik |
| 12 | *Atriplex tatarica* L. | 1-2 | 25-70 | çiçək | II | yarımkol |
| 13 | *Poa bulbosa* L. | 2 | 10-20 | meyvə | III | çoxillik |
| 14 | *Halocnemum strobilaceum* (Pall) Bieb. | 2-3 | 10-50 | meyvə | II | yarımkol |
| 15 | *Koelpinia linearis* Pall. | 2 | 15-30 | meyvə | III | birillik |
| 16 | *Ceratocarpus arenarius* L. | 3 | 5-25 | meyvə | III | birillik |
| 17 | *Salsola dendroides* Pall. i dr. | 3 | 80-100 | çiçək | II | yarımkol |



**Şək.1.Otlağın son durumu**

Şirvanın aran ərazilərində monitorinq qiymətləndirilmə aparılmaqla hər baş mal-qaraya norma ilə nəzərdə tutulan yemin miqdarı yem vahidi ilə hesablanmışdır. Belə ki, 2015-2017-ci ildə aran Şirvanda 1053137 baş iri buynuzlu mal-qaraya 31594, 11 ton yem vahidi, 235382 baş xırda buynuzlu mal-qaraya isə 70614,84 ton yem vahidi düşür. Nəzərə alsaq ki, təkcə Kür-Araz ovalığının cəmi 345170 ha olan qış otlaqlarında 2017- ci ildə 3406965 baş mal-qaraya (1053137 baş iri buynuzlu, 2353828 baş xırda buynuzlu) 2248596,90 ha otlaq sahəsi ayrılmalıdır. Ancaq mövcud olan otlaq sahəsi (345170 ha) lazım olandan 1903426, 90 ha azdır (şək.1) . Mövcud otlaqlarda normadan qat-qat artıq mal-qara otarılır, otlaqlar tapdanır, deqradasiyaya uğrayır, eroziya prosesləri güclənir, botaniki tərkibi pisləşir, bitki örtüyünün məhsuldarlığı aşağı düşür ki, bunun da nəticəsində bozqırlaşma və səhralaşma intensivləşir. Şirvan düzünün suvarılan torpaqlarının 67,5%-i (115,6 min.ha) şorakətləşmişdir. Sahə 35-40% bitki ilə örtülmüşdür, əsas növlər indikator bitkilər olan: ağacvari şoran, budaqlı qışotu, avropa duzlaq çoğanı, qaraşoran, şahsevdi və digər halofit bitkilərdən ibarətdir.

Buna görə də aran Şirvan ərazisində məhsuldarlıq və otlağın yükü hesab laqnmışdır. Bunun üçün öncə seçilən bitkilərin məhsuldarlığı təyin edilmişdir.

Toplanmış yerüstü otun (*Herba*) orta çəkisi (kq) - $\sum V$ - 23, 16, 24, 27, 19, 21, 20, 25, 13, 26 = 214

Orta çəkinin kvadratı - $\sum V^2$ - 529, 256, 576, 729, 361, 441, 400, 625, 169, 676 = 4762

$$M = \frac{214}{10} = 21{,}4$$

$$C = \sum V^2 - \frac{\left(\sum V\right)^2}{n},$$

$$C = 4762 - \frac{(214)^2}{10} = 4762 - 4580 = 182$$

$$\sigma = \sqrt{\frac{C}{n-1}} = \sqrt{\frac{182}{10-1}} = \sqrt{\frac{182}{9}} = \sqrt{20{,}22} = 4{,}51$$

$$m = \frac{4{,}51}{\sqrt{10}} = \frac{4{,}51}{3{,}16} = 1{,}43$$

M ± m = 21, 4 ± 1, 43 kq/ha,

$$P = \frac{m}{M}100 = \frac{1{,}43}{21{,}4}100 = 6{,}7\%$$

Lerchian yovşanı - *Artemisia fragrans* üçün:

$\sum V$ - 33, 28, 29, 34, 27, 25, 31, 34, 26, 22 = 289

$\sum V^2$ - 1089,784, 841, 1156, 729,625, 961, 1156, 676, 484 = 8501

$$M = \frac{289}{10} = 28{,}9$$

$$C = \sum V^2 - \frac{\left(\sum V\right)^2}{n},$$

$$C = 8501 - \frac{(289)^2}{10} = 8501 - 8352 = 149$$

$$\sigma = \sqrt{\frac{C}{n-1}} = \sqrt{\frac{149}{10-1}} = \sqrt{\frac{149}{9}} = \sqrt{16{,}56} = 4{,}07$$

$$m = \frac{4{,}07}{\sqrt{10}} = \frac{4{,}07}{3{,}16} = 1{,}29$$

M ± m = 28, 9 ± 1, 29 kq /ha,

$$P = \frac{m}{M}100 = \frac{1{,}29}{28{,}9}100 = 4{,}5\%$$

Tədqiqat dövründə seçilmiş 15 stasionar məntəqə üzrə öyrənilmiş qalan 13 bitkinin də: Ağ məryəmnoxudu - *Teucriun polium* (29,5 ± 0,8); Adi boymadərən - *Achillea millefolium* (32,6 ± 1,25); Ilanbaş sürvə - *Salvia dracocephaloides* (47,9 ± 1,18); Buynuzlu qurdotu - *Lotus corniculatus* ( 23,2 ± 0,6); Meyer dəvəayağı - *Limonium meyer* (43,7 ± 2,11); Qovuqlu bozalaq-*Lepidum vesicarium* (36, 9 ± 1,0); Tikanlı karvanqıran - *Atrophaxis spinosa* ( 65,5 ± 2,34); Soğanaqlı ətirşah - *Geranium tuherosum* (25,6 ± 1,28 ); Meyer pişiknanəsi - *Nepeta meyeri* (31,3 ± 1,55 ); Şüalı dağ keşnişi - *Bifora radians* Bieb. (18,4 ± 1,46 ); Üçbölümlü yatıq qanqal - *Bides tripartita* L. (28, 7 ± 1,80); Çöl qatırquyruğu - *Equisetum arvense* L. (22, 3 ± 1,60 ); Təpəlik kəklikotu - *Thymus collinus* (25,9 ± 1,05) növlərinin təbii ehtiyatı yarpaqsız öldürgən və lerxian yovşanında olduğu kimi anoloji qaydada hesablanmışdır.

Beləliklə, Şirvanın səhra və yarımsəhra zonalarında yerləşən qış otlaqlarının əsas fitosenozlarında (yovşanlı, yovşanlı-efemerli, şoranlı, şoranlı-efemerli, birillik şoranlı, öldürgənli və s.) yem bitkiləri (yaşıl, quru) qiymətləndirilmiş, məhsuldarlığı öyrənilmiş və 1 ha otlaq sahəsində neçə baş iri buynuzlu və xırda buynuzlu mal-qaranın saxlanılması mümkün olan baş sayı (otlaq yükü) müəyyən edilmişdir. Məlum olmuşdur ki, qış otlaqlarının hazırki vəziyyətində otlaqların yaşıl yem məhsuldarlığı 3,8 və 8-12 sent/ha, quru yem məhsuldarlığı isə 1,5-5 və 2,4-6,7 sent/ha arasında dəyişir. Bu otlaqların 1 ha-da mövsüm ərzində minimum 1-2, maksimum 2-3 baş iri buynuzlu və minimum 3-4, maksimum 5-6 baş xırda buyunuzlu mal-qara saxlamaq olar.

**ƏDƏBİYYAT**

1. Təbii yem sahələrinin tədqiqat metodikası. BDU nəşr. Bakı,1995, 52 səh. 2.Бейдеман И.Н. Методика фенологический наблюдений при геоботанических исследованиях. М.-Л.: АН СССР, 1954, 128 с. 3. Бейдеман И.Н., Бесполова З.Г., Рахманина А.Т. Эколого-геоботанические и агромелиоративные исследования в Кура-Араксинской низменности Закавказья. Изд.АН СССР, Москва-Ленинград, 1962, с. 464 . 4.Залибеков З.Г. Об условиях мобилизации биологического потенциала аридных земель // Проблемы освоения пустынь. Научно-теоротический журнал. Ашхабад, Изд. «Ылым», 1990, №1, с. 16-31. 5.Миланов С.О. Системный подход к управлению процессами природ-нопользования в аридных регионах // Проблемы освоения пустынь. Научно-теоротический журнал. Ашхабад, Изд. «Ылым», 1990, №1, с.176. 6.Набиева Ф.Х. Развития эрозионных процессов в бассейне реки Турианчай / Тезисы докл. Респ.Научнотехн.Конференции Молодых ученых и специалистов и сохранение сельскохозяйственной продукции», Баку, 1991, с.29-30. 7.Раменски Л.Г. Учет и описание растительности М.,Изд.ВАСХНИЛ, 1937, с.100. 8.Фрид А.С Методология оценки устойчивости почв к деградации. М., Почвоведение, 1999, №3, с. 399-404. 9.Шенников А.П. Луговая растительность СССР. В кн.: Растительность СССР. М.Л., т.1, 1938, с. 429-647. 10.Ярошенко П.Д. К методике определения веса травостоев по высоте основной массы и проективному покрытию. Ботанический ж., 1967, №4, с. 11.The informative cartographic reference book of Azerbaijan. Zamani company, Baku cartographical factory of the state committee on geodesy and cartography of the Azerbaijan Republic. Baku, 1999-2000. p. 172-183

**Современное состояние пастбищных территорий равнинного Ширвана**

**Т.Э.Касимзаде**

В статье представлены данные о современном состоянии пастбищ равнинного Ширвана, емкости пастбищ и их продуктивности. В 2015-2017 годах была проведена мониторинговая оценка по определению кормовой нормы на каждое поголовье скота с расчетом кормовых единиц. Таким образом, для Равнинного Ширвана на 1053137 голов крупного рогатого скота приходится 31594,11т кормовых единиц, на 235382 голов мелкого рогатого скота - 70614,84 т кормовых единиц. 345170 га территории составляют пастбища, на которых суммарно выпасается около 3406965 голов рогатого скота (1053137 голов крупного и 2353828 голов мелкого рогатого скота), хотя на такое количество должно быть выделено 2248596,90га. Но территория меньше требуемой на 1903426,90 га.

***Ключевые слова:*** *равнинный Ширван, пастбище, продуктивность, растительный покров*

**The modern conditions of the pasture terrıtorıes of the flat Shırvan**

**T.E.Gasimzade**

Data on the current state of the pastures of the flat Shirvan, pasture capacity and productivity have been shown in the paper. Monitoring assessment was conducted to determine the feed rate for each livestock with the calculation of feed units in 2015-2017. Thus, on the flat Shirvan for 1053137 head of cattle is 31594.11t of feed units, for 235382 heads of small horned - 70614.84 tons of fodder units. 345170 hectares of the territory are pastures where about 340,669 head of cattle graze (1053137 head of large and 2353828 heads of small cattle), although this amount should be allocated 2248596.90 hectares. So, the territory is less than 1903426.90 hectares.

***Key words:*** *flat Shirvan, pasture, productivity, plant cover*